ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)

JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 2, Sıra 4, 2021, 26-36

# MIDDLE EAST CONFLICT AMID UN RULINGS

**Samid Baghirov**[1]
UDC 327.
KBT 66.4

**Keywords:**

Middle East
Israeli-Palestinian conflict
UN
Resolution
Jerusalem
West Bank

**ABSTRACT**

Currently, there are many conflicts in the world, the reason for the duration of which is the failure to implement the decisions taken in connection with these confrontations by the United Nations, which represents the world community. The same kind of reasons contributed to the long stay under the occupation of the occupied territories of the Republic of Azerbaijan. Despite the fact that at one time the world community made important decisions regarding the hotbeds of conflict, they were not implemented and over time such issues as the occupation and fragmentation of territories were imposed as "fact" and "reality".

This trend is no exception for the Israeli-Palestinian confrontation, which is known in the political arena as the Middle East conflict. At most stages of this conflict, the international community demonstrated its position and documented them in the format of various rulings. In 1947, the UN General Assembly issued Resolution No. 181 on the establishment of a Jewish and Palestinian states on the territory of Palestine. According to the decision, 57% of the territory of Palestine fell to the Jews, and 42% to the Arabs. The remaining 1% of the territory where the city of Jerusalem was located was to become international territory. This was the first international resolution to resolve the Israeli-Palestinian conflict that has yet to be implemented.

As you can see, the conflict did not remain abstract for the views of the world community and enough fateful decisions were made. One of the most necessary steps for the correct interpretation of the conflict here is an accurate and consistent study of the UN decisions.

[1]. ANAS, Institute of Oriental Studies
sami80@mail.ru
*Received: 14.04.2021*
*Accepted: 07.06.2021*

# YAXIN ŞƏRQ MÜNAQİŞƏSİ BMT QƏRARLARI FONUNDA

**Samid Bağırov**[1]
UOT 327.
KBT 66.4

**Açar sözlər:**

Yaxın Şərq
İsrail-Fələstin münaqişəsi
BMT
qətnamə
Qüds
İordan çayının qərb sahili

**ANNOTASİYA**

Dünyada hazırda çoxlu münaqişələr var ki, onların davamiyyətinin səbəbi dünya ictimaiyyətini təmsil edən Birləşmiş Millətlər Təşkilatının həmin qarşıdurmalarla bağlı qəbul etdiyi qərarlarının icra edilməməsidir. Azərbaycan Respublikasının zəbt edilən ərazilərinin uzun müddət işğalda qalmasının səbəbi də bu qəbildəndir. Dünya ictimaiyyəti zamanında münaqişə ocaqları ilə bağlı mühüm qərarlar qəbul etsə də bu qərarlar icra edilmir və ərazilərin işğalı və parçalanması kimi məsələlər zaman keçdikdə "fakt" və reallıq" kimi qəbul etdirilir.

Siyasi arenada Yaxın Şərq münaqişəsi kimi tanınan İsrail-Fələstin qarşıdurması da bu tendensiyadan müstəsna deyil. Bu münaqişənin tarixinin əksər mərhələlərində beynəlxalq ictimaiyyət mövqe bildirib və onları müxtəlif qərarlar formatında sənədləşdirib. 1947-ci ildə BMT Baş Assambleyası Fələstin ərazisində yəhudi və ərəb dövlətlərinin qurulması haqqında 181 saylı qərar çıxartdı.Qərara əsasən Fələstinin 57%-i yəhudi, 42%-i isə ərəb dövlətinin payına düşürdü. Qüds şəhərinin yerləşdiyi qalan 1% ərazi isə beynəlxalq ərazi olmalı idi. Bu qərar Fələstin İsrail münaqişəsinin nizamlanması üçün ilk beynəlxalq qərar idi ki, hələ də icra edilməyib.

Göründüyü kimi münaqişə dünya ictimaiyyətinin diqqətindən kənar qalmayıb və kifayət qədər həlledici qərarlar verilib. Burada Münaqişənin düzgün izah edilməsi üçün BMT qərarlarının dəqiq və ardıcıllıqla araşdırılması ən zəruri addımlardandır.

[1]. AMEA Z.M.Bünyadov adına Şərqşünaslıq institutunun Ərəb ölkələri tarixi və iqtisadiyyatı şöbəsinin elmi işçisi
sami80@mail.ru
*Məqalə redaksiyaya daxil olmuşdur: 14.04.2021*
*Təkrar işlənməyə göndərilmişdir: 07.05.2021*
*Çapa qəbul edilmişdir: 07.06.2021*

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)



# БЛИЖНЕВОСТОЧНЫЙ КОНФЛИКТ НА ФОНЕ ПОСТАНОВЛЕНИЙ ООН

**Самид Багиров** [1]

УДК 327.
КВТ 66.4

**Ключевые слова:**

Ближний восток
Израильско-палестинский конфликт
Оон
Резолюция
Иерусалим
Западный берег реки иордан

## АННОТАЦИЯ

В настоящее время в мире существует множество конфликтов, причиной продолжительности которых является невыполнение принятых в связи с этими противостояниями решений Организации Объединенных Наций, представляющей мировое сообщество. Такого же рода причины способствовали длительному пребыванию под оккупацией захваченных территорий Азербайджанской Республики. Несмотря на то, что в свое время мировое сообщество принимало важные решения относительно очагов конфликта они не выполнялись и со временем такие вопросы как оккупация и раздробление территорий навязывались как «факт» и «реальность».

Данная тенденция не является исключением и для израильско-палестинского противостояния, которое на политической арене известно как ближневосточный конфликт. На большинстве этапов данного конфликта международное сообщество демонстрировало позицию и задокументировало их в формате различных постановлений. В 1947 году Генеральная Ассамблея ООН вынесла постановление под номером 181 о создании еврейского и палестинского государств на территории Палестины. Согласно решению, 57% территории Палестины выпадало на долю евреев, а 42% арабов. Оставшийся 1% территории, где находился город Иерусалим должен был стать международной территорией. Это было первым международным постановлением для урегулирования израильско-палестинского конфликта, которое до сих пор не выполнено.

Как видно, конфликт не остался абстрактным для взглядов мирового сообщества и было принято достаточно судьбоносных решений. Одним из самых необходимых шагов для правильной интерпретации конфликта здесь - это точное и последовательное исследование решений ООН.

[1]. НАНА, Институт Востоковедения
sami80@mail.ru

## GİRİŞ

Yaxın Şərq münaqişəsinin obyektiv şəkildə izah edilməsi üçün beynəlxalq qərarlar nöqteyi-nəzərindən yanaşmaq lazımdır. İlk növbədə qeyd etmək lazımdır ki, münaqişə əsasən ərəblər tərəfindən məskünlaşmış Fələstin ərazisində yəhudi dövlətinin yaradılması nəticəsində meydana gəldi. İsrail dövlətinin yaradılması tələbi sionist yəhudi hərəkatının, yəni Sion dağına qayıdışa cağıran hərəkatın əsas məqsədi və proqramı idi. Bu proqram yəhudi təşkilatların Birinci dünya konqresində qəbul edildi. Fələstin ərazisində yəhudi dövlətinin yaradılması yəhudilərin anlayışında "tarixi ədalət prinsipi"nə arxalanır və burada e.ə. X-VI yüzilliklərdə olmuş İsrail və İudeya dövlətlərinə dəlalət edir. Bu səbədən yəhudilər üçün Qüds ətrafında mərkəzləşmək vacib dövlət quruculuğu prinsipidir. Eyni zamanda müsəlman dünyası və ərəblər üçün də Qüds və onun dini məkanları müqqəddəs və vətən əhəmiyyətli məkandır. Bu səbəbdən Qüds statusu, şəhərin kimin nəzarətində olması Fələstin probleminin ən çətin məsələsi sayıır.

### Britaniyanın Fələstində yəhudi dövlətinin yaradılması ilə bağlı mövqeyi

Britaniya höküməti ərəb tayfalarını Birinci dünya savaşı zamanı Osmanlı dövlətinə qarşı qaldırmaq məqsədi ilə Məkkə şərifi Huseyn ibn Əliyə Fələstin daxil olmaqla müstəqil Ərəb dövlətinin yaradılmasını vəd etmişdi. Şərifin oğlu Feysəlin rəhbərliyi altında üsyan ərəb ərazilərinın, Suriya və İraqın Osmanlılardan alınmasında əhəmiyyətli rol oynadı. Lakin eyni zamanda Britaniyanın Fələstində, yəhudi əhalisinin az məskunlaşdığı Osmanlı bölgəsində "Yəhudi xalqı üçün milli vətən" in qurulmasına dəstəyini elan edən Balfur Bəyannaməsi (2 noyabr 1917) qəbul edildi. Bəyannamə Birləşmiş Krallığın Xarici İşlər Naziri Artur Balfurdan İngilis Yəhudi İcmasının lideri Lord Rotşildin Böyük Britaniya və İrlandiya Sionist Federasiyasına ötürülməsi üçün 2 Noyabr 1917-ci il tarixli bir məktubda yer aldı. Bu bəyannamə dünyanın müxtəlif bölgələrində xüsusilə də Avropanın şərqindəki yəhudilərin "əcdadlarının yurdu"na qayıtması üçün ilk ən ciddi beynəlxalq cəhd hesab edilir.

Fransa və Britaniya hökümətləri Osmanlı dövləti ərazilərinin paylaşılmasına dair 1916-cı ildə Sayks-Piko sazişi adı ilə tanınmış razılaşma imzaladılar. Sonra bu sazişə Rusiya və İtaliya da qoşuldu. Həmin sazişə əsasən Osmanlı əraziləri ölkələr arasında onların idarəsi zonalarına bölünməli idi. Fələstin Britaniya zonasına daxil edilmişdi.

Britaniya San-Remo sazişi (1920) ilə Fələstini tam şəkildə qəyyumluğa götürdü və bölgənin üzərində mandat hüququna malik olduğunu elan etdi. Ərəb qaynaqlarının iddiasına görə bu mandatlıq dönəminin başlamasından 1948-ə qədər həyata keçirilən yəhudilərin böyük köçü nəticəsində Fələstindəki bu xalqın sayı 55 mindən 646 minə çatdı və 8%-dən 31.7%-ə yüksəldi.[1] Qeyd edilən rəqəmlər olduğu kimi qarşı tərəfdən qəbul edilməsə də, ümumi şəkildə köç tendensiyasının Fələstindəki yəhudilərin sayının bir neçə qat artmasına gətirib çıxarması təkzib edilmir. Daha sonra dünyada faşizmin baş qaldırması, Britaniyanın qəyyumluğu dövründə Fələstinə köçənlərə torpaq, əmlak və hüquqi məsələlərlə bağlı güzəştlərin edilməsi və imtiyazların verilməsi

[1] Samih Şubeyb, *əl-İstitan vəl-hicrə fil-fikr əs-Səhyuni,* Mərkəz Əbhas əl-Filəstiniyyə, Ramallah (1999)

ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 2, Sıra 4, 2021, 26-36

bu tendensiyanı sürətləndirirdi. İsrail təsis ediləndən sonra "vətənə qayıdış"la bağlı qanunun qüvvəyə minməsi, sözügedən prosesi daha da sürətləndirirdi. İkinci dünya müharibəsindən öncə bir neçə dəfə Fələstin ərəblərinin Britaniyaya və hərbi baxımdan təşkilatlanmış yəhudilərə qarşı silahlı çıxışları oldu. Yəhudilərlə ərəblər arasında toqquşmaların "qabağını almaq iqtidarını özündə görməyən" Britaniya Fələstin məsələsini yeni yaranmış BMT Assambleyasında baxılması üçün təqdim etdi.

**Fələstin və İsrail dövlətlərinin yaranması layihəsi və BMT qərarı**

1947-ci il noyabr ayının 29-da BMT Baş Assambleyası Fələstin ərazisində yəhudi və ərəb dövlətlərinin qurulması haqqında 181 saylı qərar çıxartdı.Qərara əsasən Fələstinin 57%-i yəhudi, 42%-i isə ərəb dövlətinin payına düşürdü. Qüds şəhərinin yerləşdiyi qalan 1% ərazi isə beynəlxalq ərazi olmalı idi. Bu qərar, Fələstin İsrail münaqişəsinin nizamlanması üçün ilk beynəlxalq qərar idi ki, hələ də icra edilməyib.[1]

BMT-nin bu qərarından sonra Britaniya bölgədən çıxmağa başladı. Britaniyanın çıxmasından sonra yəhudi təşkilatları 1948-ci il may ayının 14-ü birtərəfli qaydada müstəqil İsrail dövlətinin yaradıldığını elan etdilər. İsrail ordusu həmin ilin may ayından 1949-cu ilin yanvar ayına qədər təcrübəsiz və qeyri-nizami olan fələstinliləri və yardıma gələn digər ərəb ordularını məğlub etdi. İsrail Ordusu bu zaman artıq 20,770 kvadrat km ərazini nəzarətə götürə və zəbt edə bildi. Bu ərazilər BMT-nin 181 saylı qərarının ona verdiyi ərazilərdən həddən artıq çox idi. Həmin ərazilərdə yaşayan 925 min fələstinlinin 700 min nəfəri qaçqın vəziyyətinə düşdü. Fələstinin qalan ərazilərini – İordan Çayının Qərb Sahilini əhatə edən 5876 kvadrat km ərazini İordaniya, Qəzza Zolağını (360 kvadrat km) isə Misir öz nəzarətinə götürdü.

1956-cı ildə Camal Əbdünnasirin Suveyş kanalının milliləşdirilməsilə bağlı qərarından sonra Britaniya, Fransa və İsrailin bu ölkəyə qarşı savaş açması əsnasında Qəzza zolağı da İsrail tərəfindən zəbt edildi. Bu işğal bir il sürdü.

**Ərəb-Fələstin müqaviməti və Fələstin Azadlıq Təşkilatı**

1964-cü ildə Fələstin Azadlıq Təşkilatı yaradıldı və bu təşkilat fələstinliləri Ərəb Dövlətləri Liqasında təmsil etməklə yanaşı, onları BMT və digər beynəlxalq dairələrdə də təmsil edən ilk qurum oldu. Bu qurum İordan çayının Qərb sahilini, Qəzzanı eləcə də (hazırda sayı minimum altı milyon olan) xaricdə qaçqın vəziyyətində yaşayan fələstinlilərin işlərini idarə etmək səlahiyyətlərini öhdəsinə götürdü. Qeyd edək ki, 2011-ci ilin statistikalarına əsasən dünyada minimum 11 milyon fələstinli var ki, onların təxminən yarısı Fələstin torpaqlarından kənarda yaşayır, qalanı isə İordan çayının Qərbində, Qəzzada və bir qismi isə İsrailin daxilində yaşayırlar. Onu da qeyd edək ki, hazırda İsrailin daxilində yaşayan və İsrail vətəndaşı olan fələstinlilərin sayı 1,890,000 nəfərdir ki, İsrail əhalisinin 21 faizini təşkil edir. Onların 8 faizi xristiandır. Onlara 1948-ci ilin ərəbləri də deyilir. İsrailin Qəzzaya son hücumu fonunda bu ərəblərin yaşadığı bölgələrdə də qarşıdurmalar şiddətlənib və vəziyyətin nəzarətdən çıxmasına görə, İsrailin daxilində bir neçə şəhərdə komendant saatı tətbiq edilib.

---
[1] General Assembly, *Resolution 181 (II). Future government of Palestine*, **https://unispal.un.org/DPA/DPR/unispal.nsf/0/7F0AF2BD897689B785256C330061D253**

Fələstin tərəfi münaqişə başlayandan indiyə qədər BMT qətnamələrindən təqribən 40-nın İsrailin əleyinə olduğunu bildirir. Eləcə də İsrail bir sıra BMT qərarlarını rəhbər tutaraq, fələstinli hərəkatları hədəfə alır. Münaqişə ilə bağlı qərarların ən əhəmiyyətlisi 1967-ci il altı günlük Ərəb-İsrail müharibəsinin ardından BMT TŞ-da qəbul edilmiş 242-ci qətnamədir. 1967-ci ilin iyununda baş verən bu müharibədə İsrail İordan çayının Qərbini, Qüds şəhərinin bütününü, Qəzzanı, Sinay Yarımadasını, Suriyanın Colan Təpələrini (497-ci qətnamə) zəbt etdi. 242-ci qətnamə İsrail qüvvələrindən “son müharibədə zəbt edilmiş əraziləri tərk etməyi” tələb etdi.

1967-ci ilin müharibəsi və onun ərəblər üçün acı nəticələri hazırda da münaqişənin həllinə kölgə salan əsas maneə hesab edilir. İsrailin İordan çayının Qərb sahilindən çıxmaması, burada 200-dən çox yaşayış massivi salması (BMT TŞ-nın bu barədə 2234-cü qətnaməsi var, həmçinin Avropa İttifaqı bu massivləri tikən şirkətlərə sanksiya tətbiq və bu massivlərin məhsullarını boykot edib), bu massivləri və İordan vadisini İsrailə ilhaq etmək üçün çabası, buradan köçürülən milyonlarla fələstinlinin qayıtmasına maneə yaratmaq, Qüdsün şərqini hələ də işğalda saxlaması, Qüdsün hüquqi, inzibati və fiziki vəziyyətində dəyişikliklər etməsi, Fələstin dövlətinin təsisinə mane olmaq, Qüdsü İsrailin paytaxtı elan etmək (Donald Trampın əsrin sazişi planının bir hissəsi) münaqişənin sülh yolu ilə tam tənzimlənməsinə maneə yaradan əsas amillərdir.

1973-cü ilin oktyabrında Suriya və Misir İsrailin altı günlük müharibədə zəbt etdiyi əraziləri geri qaytarmaq üçün növbəti dəfə hərəkətə keçdilər. Suriya Colan yüksəkliklərini geri ala bilməsə də Misir Sinay Yarımadasında irəlilədi və sonda 1978-ci ildə ABŞ-ın vasitəçiliyi ilə imzalanan Kəmp Devid, bir il sonra, yəni 1979-cu ildə Misir-İsrail sülh anlaşması ilə nəticələndi və rəsmi Qahirə Sinay Yarımadası və Suveyş kanalı üzərində suverenliyini təmin etdi. Beləliklə Misir İsraili dövlət kimi tanıyan ilk ərəb ölkəsi oldu.

Fələstinə gəldikdə isə bir çox illər ərzində İsrail İordan çayının Qərb sahilinin və Qəzza zolağının taleyinə aid məhz qonşu ərəb ölkələri ilə danışıqlar aparırdı və bilavasitə Fələstin Azadlıq Təşkilatı (FAT) ilə danışıqlar aparmaqdan imtina edirdi, buna səbəb İsrailin FAT-ı terror təşkilatı hesab etməsi idi.

1974-cü ildə Ərəb Dövlətləri Liqası FAT-ı fələstinlərin rəsmən birbaşa nümayəndəsi olduğunu qəbul etdi və bunun nəticəsində FAT-ın statusu möhkəmləndi. Digər tərəfdən Misir-İsaril sülh müqaviləsi fələstinlilərin İordan çayının Qərb sahilinidə və Qəzza zolağında özünü idarətetmə sistemini təşkil etmələrinə yardım etmiş oldu.

1987-ci ildə İordan çayının Qərb sahilinidə və Qəzza zolağında birinci Fələstin “İntifadə” (oyanış) hərəkatı başladı. Fələstinlilərin 1987-ci ildən 1991-ci ilə kimi bu üsyanının məqsədi 1967-də işğal edilən ərazilərin azad edilməsi, paytaxtı Şərqi-Qüds olmaqla Fələstin dövlətinin təsisi idi.

### Qüdsün statusu problemi

BMT Baş Assambleyası iki dövlətin yaradılması haqqında 1947-ci ildə qəbul etdiyi qərarda Qüdsün ərazisini beynəlxalq ictimaiyyətin idarəçiliyində olan zona elan etmişdi. 1949 ilin dekabrında İsrail işğal etdiyi Qərbi Yerusəlimi özünün paytaxtı elan etdi. Cavab olaraq bir qədər sonra 1950-ci ilin aprel ayında İordan cayının Qərb sahilini nəzarətinə almış İordaniya Şərqi Yerusəlimi

özünün ikinci paytaxtı elan etdi. "Altı günlük" müharibə nəticəsində Şərqi Yerusəlimi də ələ keçirmiş İsrailin knesseti bütün Yerusəlimi 1980 ildə yəhudi dövlətinin vahid və bölünməz paytaxtı elan etdi. Bu qərar beynəlxalq ictimaiyyətdə böyük etrazlarla qarşılandı. Əvvəl Qərbi Yerusəlmdə səfirliklərini açmış bir çox ölkələr öz nümayəndəliklərini Təl-Əvivə keçirdilər. BMT TŞ Qüds probleminə dair müxtəlif zamanlarda 242, 252, 253, 271, 465, 476, 478, 1322, 1397 və sair qərarları çıxartdı.[1] Bu qərarlar İsraildən Qüdsün hüquqi, inzibati və fiziki vəziyyətini dəyişməsini dayandırmağı, əl-Əqsa məscidi və ətrafında İsrail qüvvələrinin addımlarının dayandırılmasını tələb edir. Eləcə də BMT Baş Assambleyasının oxşar məzmunlu 12 qərarı tarixə düşüb.

1988-ci ildə İordaniya İordan çayının Qərb sahilinə olan istəyindən gələcək Fələstin dövlətinin xeyrinə əl çəkdi. Artıq münaqişənin həmişəlik nizamlanması üçün beynəlxalq tərəflərdən İsrailə və fələstinlilərə təzyiqlər artırdı.

## Sülh danışıqları və onların nəticələri

1991-ci ildə Madrid sülh konfransı keçirildi, orada İsrail nümayəndələri ilk dəfə Fələstin nümayəndələri ilə görüşdü. Konfrans praktiki nəticələr verməsə də, görüşdə tərəflər "sülh qarşılığında ərazi" prinsipi ilə faktiki olaraq razılaşdılar. Bunun nəticəsi olaraq 1993-cü ildə Oslo anlaşması imzalandı.[2] İsrail, Fələstin Azadlıq Təşkilatını fələstinlilərin rəsmi qurumu kimi tanıdı. Anlaşmaya əsasən İsrail Qəzzanı və digər bölgələri tərk etməli idi. İsrail Qəzzanı 2005-ci ildə tərk etdi, İordan çayının Qərbini isə, burada olan (və ya sonradan salınan) yəhudi yaşayış massivlərinə görə tam olaraq tərk etmədi.

2000-ci ildə baş nazir Ariel Şaronun əl-Əqsa məscidi kompleksinə daxil olması bütün Fələstin torpaqlarında İkinci İntifadə hərəkatının başlamasına səbəb oldu. Beş il intensiv üsyan, qarşıdurmalar sonda 2005-ci ildə Mahmud Abbas və Ariel Şaronun Şərm-Şeyxdə görüşü və razılaşması ilə dayandı. Bu müddət ərzində fələstinlilər 4,412, israillilər isə 1,069 canlı itki verdilər.

## Ərəb Sülh Təşəbbüsü

2002-ci ildə Səudiyyə Ərəbistanı kralı Abdullah bin Əbdüləziz tərəfindən irəli sürülən "Mübadərat əs-Sələm əl-Ərəbiyyə" (Ərəb sülh təşəbbüsü) hazırda da müsəlman dünyası və dünya ictimaiyyətinin, münaqişənin nizamlanması istiqamətində ən çox məqbul sayılan təklifidir.[3] Bu təşəbbüs əslində 1991-ci ilin Madrid razılaşmasının yenisi və onu təsdiq və tətbiq edən addımı hesab edilir. Təklif, 1967-ci ilin əraziləri üzərində paytaxtı Şərqi-Qüds olmaqla müstəqil Fələstin dövlətinin tanınması, qaçqınların qayıtması və Colanın Suriyaya qaytarılması qarşılığında ərəb dövlətlərinin İsraili tanıması və əbədi sülhün imzalanmasından ibarətdir. Bu təşəbbüs BMT TŞ-nın 242 və 338-ci qətnamələrini rəhbər tutur.

Bu təşəbbüs hazırda əksər ərəb, müsəlman və dünya ölkələri tərəfindən məqbul sayılır. Müsəlman ölkələrindən İran,

[1] Məcdi İsa, *Qərarat əl-Uməmiyyə vəl-Qədiyyəl-Filəstiniyyə*, Mərkəz Əbhas əl-Filəstiniyyə, əl-Birə, (1999)

[2] U.S.Department of State, *Declaration of Principles on Interim Self-Government Arrangements*, 2003, https://web.archive.org/web/20030823194850/http://www.state.gov/p/nea/rls/22602.htm

[3] Al-Jazeera, *Bunud mubadərət əs-səlam əl-ərəbiyyə*, 3.10.2004, https://www.aljazeera.net/2004/10/03/

Fələstin hərəkatlarından isə HƏMAS fərqli təklif irəli sürürlər ki, müəyyən beynəlxalq təcrübələrə və prinsiplərə arxalansa da real görünmür. Onların təklifə əsasən bütün fələstinli qaçqınlar tarixi torpaqlarına qayıtmalı və burada olan bölgənin əsl yəhudi sakinləri ilə fələstinlilər birgə referenduma qatılmalı və taleyini referendum yolu ilə müəyyənləşdirməlidirlər.

### Trampın "Əsrin sazişi" planı

Digər təşəbbüs isə son illərdə sabiq ABŞ prezidenti Donald Tramp tərəfindən irəli sürülüb və ona "Əsrin sazişi" də deyilir. Bu plana əsasən Qüds İsrailin paytaxtı, tarixi şəhərin kənarındakı Əbu-Dis qəsəbəsi isə məhdud səlahiyyətli və hərbi gücü məhdud olan Fələstin dövlətinin paytaxtı olacaq (və əslində İsrailin nəzarətində olan ərazi ilə əhatə ediləcək).[1] Qaçqın düşmüş fələstinlilər isə ərazi mübadiləsi nəticəsində İsrailin və Misirin ayıracağı yerlərdə yerləşdiriləcək. Fələstinlilər bu planı qəbul etsələr, ilk mərhələdə onların torpaqlarında 50 milyardlıq sərmayə yatırılacaq. Həmçinin bu plana əsasən İordan çayının Qərbindəki yəhudi yaşayış massivləri və İordan vadisi də İsrailə ilhaq ediləcək. Ədalətli görünməsə də Donlad Tramp çıxışlarında bu planı ən real təklif kimi fələstinlilərə və ərəblərə təqdim edir və onları fakt qarşısında qoymağa çalışırdı. Bəzi eksperlətrin fikrinə görə Misir və İordaniyadan sonra ABŞ-ın təzyiq və təşviqi ilə daha 4 ərəb dövlətinin 2020-ci ildə İsraillə əlaqələri normallaşdırması və rəsmiləşdirməsi Trampın təklifinin realizə olmağa doğru getdiyini göstərir. Bu təklif mətbuata sızdırıldıqdan və elan ediləndən sonra beynəlxalq təşkilatlar və dünya ölkələrinin böyük əksəriyyəti tərəfindən rədd edilib.

### Fələstin müqavimətində parçalanma

2005-ci ildə İsrailin Qəzzadan çıxması, burada İsraillə danışıqlara getməyi istəməyən hərəkatların möhkəmlənməsi, 2006-cı ildə İsrail-Livan (və ya İsrail -Hizbullah) 33 günlük müharibəsinin başlaması Fələstin-İsrail qarşıdurmasının yeni mərhələyə qədəm qoymasından xəbər verirdi. 2000-ci ildə Livanın cənubundan çıxan İsrail 2006-cı ildə oğurlanmış əsgərlərilə bağlı Livana və Hizbullaha hücum edəndə ikincinin raket zərbələrilə üzləşdi. (Qeyd edək ki hal-hazırda Livan-İsrail arasında ərazi iddiaları hələ də yaşanmaqdadır. Livan Məzare-Şəba dağlıq bölgəsinin işğal edildiyini bildirir). Bu raketlər İsrailin şimal və mərkəzi şəhərlərinə qədər çatırdı. Daha sonra bu raketlər İranın təşəbbüsü və əsasən də Hizbullahın vasitəsilə Qəzzada HƏMAS və digər hərəkatlara çatdırıldı. Bu minvalla Fələstin müqavimət hərəkatı daşdan raketə keçmiş oldu.

Fələstindaxili parçalanmanın yaranma səbəbini anlamaq üçün İkinci Oslo anlaşmasının müddəalarına yenidən baxmaq lazımdır. Fələstin Azadlıq Təşkilatı ilə İsrail arasında əldə edilən bu razılaşma Fələstin muxtariyyətinə (onun əsas bazasını FAT üzvləri təşkil edir) imkan verirdi ki, zəbt edilmiş İordan çayının Qərb sahilinin təqribən 25-30 faizini, eləcə də Misirlə sərhəddəki Qəzzanı nəzarətə götürüb idarə etsin. Razılaşmaya əsasən İordan çayının Qərb sahili üç kateqoriyaya bölünürdü;

"A" kateqoriyalı ərazilər inzibati və təhlükəsizlik baxımından Fələstin Muxtariyyətinin nəzarətində olan ərazilərə deyilir ki, İordan çayının Qərb sahilinin yalnız üç faizini təşkil edir. Qüdsün Şərqi bura aid

[1] BBC.Arabic, *əl-Muğarridun yədəhəddəsunə ən səfqətil-qərn*, 18.02.2018, https://www.bbc.com/arabic/43097662

deyil. "B" kateqoriyalı ərazilər inzibati baxımdan Fələstin Muxtariyyətinin, təhlükəsizlik baxımından İsrail ordusunun nəzarətində olan bölgələrdir ki, təqribən 33 faiz təşkil edir. Lakin "C" kateqoriyalı ərazilər bütün müstəvilərdə İsrailin nəzarətindədir ki, buda İordan çayının Qərb sahilinin 75 faizini təşkil edir. Bu bölgü razılaşmada müvəqqəti anlaşma kimi qəbul edilmişdi. 1987-də birinci İntifadə hərəkatı zamanı yaranmış "Fələstin İslami Müqavimət Hərəkatı" (HƏMAS) və digər hərəkatlar ilk günlərdən bu razılaşmanın əleyhinə çıxış etdilər. Bundan savayı ABŞ-ın təzyiqi və vasitəsilə Fələstin Muxtariyyəti ilə İsrail arasında təhlükəsizlik müstəvidə koordinasiyanın başlaması HƏMAS və oxşar hərəkat üzvlərinin təqibi və həbsinə səbəb olurdu. 2006-cı ildə Qəzzanın HƏMAS-ın nəzarətinə keçməsindən sonra Fəth hərəkatı üzvlərinin Qəzzada, HƏMAS üvlərinin isə İordan çayının Qərbində təqibi tədricən adi hala çevrildi.

2006-cı ildə Fələstin Muxtariyyətinin nəzarətində olan ərazilərdə parlament seçkiləri keçirildi. HƏMAS bu seçkilərdə qalib gəlsə də inzibati mərkəzi Ramallahda olan Fələstin Muxtariyyətinin rəhbərliyi bu seçkilərin nəticələrilə barışa bilmədi. Fələstindaxili ixtilaf bundan sonra daha da artdı. HƏMAS bu dönəmdə Fələstin muxtariyyəti və Fəth hərəkatını ABŞ-dan maddi dəstək almaqda ittihamlandırırdı. Az keçməmiş HƏMAS üzvləri çoxluq təşkil etdiyi Qəzzanın nəzarətini ələ keçirdilər. Fələstin muxtariyyəti bu addımı çevriliş adlandırdı. Bu parlament seçkiləri 1996-cı ilin seçkilərindən sonra ikinci hesab edilirdi. Üçüncü parlament və prezident seçkiləri isə 2021-ci ilin iyun ayında keçirilməli idi ki, Fələstin Muxtariyyəti onu təxirə saldı. Səbəb isə Qüdsün şərqində seçkilərin keçirilməsinə İsrailin imkan verməməsi idi. BMT, Avropa İttifaqı və sair beynəlxalq instansiyaların bu haqda çağırış etmələrinə baxmayaraq, İsrail razılıq vermədi.[1] HƏMAS isə yenə öz növbəsində Fələstin Muxtariyyətinin seçkiləri təxirə salmasını tənqid etdi.

2006-cı ilin seçkilərindən və HƏMAS-ın Qəzzanı nəzarətə götürməsindən sonra iki milyon əhalinin yaşadığı Qəzzaya blokada tətbiq edilməyə başladı. Misir və Fəth hərəkatının HƏMAS-ı boykot etməsi və blokadaya salması ilə yanaşı, İsrail də hava, quru və sudan mühasirəni tətbiq etmişdi. Misirlə sərhəddə yerləşən yeganə "Rəfəh" sərhəd keçidi məhdud hallarda açılırdı.

Mühasirə, blokada, terror, sui-qəsd, məxfi əməliyyatlar və sair amillər İsraillə HƏMAS arasında və ya İsraillə Qəzza arasında indiyə qədər 4 müharibəyə səbəb olub. 2008-ci ilin qışı, 2012-ci ilin payızı, 2014-cü ilin yayında baş verən bu müharibələr daha çox Qəzzada canlı və maddi itkilərə səbəb oldu. HƏMAS-ın əldə etdiyi raketlər, İran və sair tərəflərdən mənimsədiyi raket sənayesi texnologiyası onun hələ də əsas "vuran əli" hesab edilir.

**Son Fələstin – İsrail qarşıdurması**

İlk üç müharibədə HƏMAS 70 km məsafəni hədəfə alırdısa, cari dördüncü müharibədə 220 km məsafəni hədəfə alır. İsrail Ordusu mənbələri bunu təsdiqləyir. Dördüncü müharibə əvvəlki üç müharibədən bir neçə cəhətdən fərqləndi. Müharibənin başlama səbəbi Qüdsün şərqində əl-Cərrah kvartalında 28 fələstinli ailənin buradan köçürülməsi ilə, eləcə də İsrail polisinin Ramazan günlərində əl-Əqsaya girişə məhdudiyyətlər tətbiq etməsilə bağlı idi.

[1] Frans24.com, *əl-İttihad əl-Urubi yətəbir ət-təcil muxəyyib lil-amal*, 30,04,2021, https://www.france24.com/ar

Ramazanın son həftəsində əl-Əqsa məscidində aksiya keçirən və buradan çıxmaq istəməyən fələstinlilərə qarşı İsrail polisinin hərəkətə keçməsi və məscidin içinə daxil olması Qəzzada olduğu kimi əksər ərəb və müsəlman ölkələrindən də qəzəbə və qınağa səbəb oldu. Əl-Əqsa məscidində və ətrafında İsrail polisinin həbslər həyata keçirməsi HƏMAS tərəfindən hiddətlə qarşılandı və "Qüdsdəki qardaşlarını tək qoymayacağını" bildirən Qəzzadakı fələstinli hərəkatlar İsrailə raket atdılar. Ötən may ayında 11 gün çəkən bu müharibə böyük itkilərə səbəb oldu. İsrail şiddətli hava və artileriya zərbələri ilə, HƏMAS və sair hərəkatlar isə Təl-Əviv və onun şimalını müxtəlif raketlərdən hədəfə aldılar. Son müharibənin digər özəlliyi bundan ibarət idi ki, Qəzzaya İordan çayının Qərbindəki bütün bölgələrdən, eləcə də İsrailin daxilində olan ərəblərin kompakt yaşadığı bölgələrdən dəstəklər gəldi. Bu bölgələrdə intensiv qarşıdurmalar, vəziyyətin nəzarətdən çıxması və nəticədə İsrail tərəfindən komendant saatının tətbiq edilməsilə nəticələndi.

Fələstin tərəfi daima müzakirə masalarında İordan çayının Qərbi və Qüdsün şərqi ilə bağlı BMT Təhlükəsizlik Şurasının 242 və 338 saylı qətnamələrini rəhbər tutulmasını tələb edir. Bu proseslərlə bağlı ABŞ-ın mövqeyinə diqqət çəkmək lazımdır. ABŞ yetmişinci illərin sonlarından İsrail-Ərəb və İsrail Fələstin münaqişəsinin "nizamalanmasında" əsas aparıcı rola malik olub. Misirlə İsrail (Kəmp Devid - 1978), İsraillə İordaniya (Vadi-Ərəbə - 1994), İsraillə - Fələstin Muxtariyyəti (Oslo -1993) arasındakı anlaşmalar birbaşa ABŞ-ın vasitəçiliyi ilə baş tutub. Oslo anlaşmasından sonra münaqişənin həmişəlik nizamlanması üçün aparılan danışıqlar da əsasən ABŞ tərəfindən dəstəklənib. Bununla yanaşı ABŞ BMT TŞ və BMT BA-da İsrailə qarşı qəbul edilən onlarla qətnamə və bəyanatı veto edən əsas dövlətdir. ABŞ-ın bu istiqamətdə sonuncu vetosu da cari İsrail-Qəzza savaşında BMT TŞ-da müharibə ilə bağlı bəyanatın qəbul edilməsinə maneə yaratmaq olub və bu son 10 gündə üç dəfə təkrarlanıb.[1]

Fələstin Muxtariyyəti ABŞ prezidenti Donald Tramp Administrasiyasının Qüdsü İsrailin paytaxtı elan etməsindən, səfirliyini Təl-Əvivdən Qüdsə köçürməsindən, Colanı İsrailin ərazisi kimi tanımasından, Fələstin Azadlıq Təşkilatının Vaşinqtondakı rəsmi nümayəndəliyini bağlamasından, BMT-nin Fələstinli qaçqınlar üzrə agentliyinə (UNRWA) yardımı dayandırmasından və sair addımlardan sonra rəsmi Vaşinqtonu vasitəçi kimi qəbul etməyəcəyini bildirdi. Bu istiqamətdə ABŞ hökumətinin atdığı daha bir addım Fələstinin və dünya ictimaiyyətinin qınağına səbəb oldu. 2020-ci ildən etibarən Beynəlxalq Cinayətlər Məhkəməsi fələstinlilərin müharibə cinayətlərilə bağlı İsrailə qarşı şikayətləri təmin edəcəyini bildirəndən sonra, bu məhkəmənin bir neçə hakiminə qarşı rəsmi Vaşinqton tərəfindən sanksiya tətbiq edildi.[2] Həmin sanksiyalar Co Baydenin dövründə aradan qaldırıldı.

Hazırda Fələstin-İsrail münaqişəsinin nizamlanması istiqamətində ən çox məqbul hesab edilən və BMT qətnamələrinin müddəalarını təmin edən həll yolu 2002-ci ildə açıqlanmış "Ərəb təşəbbüsü"dür. Bu təşəbbüs BMT, Avropa İttifaqı, Ərəb Dövlətləri Liqası, İslam Əməkdaşlıq Təşkilatı və sair beynəlxlaq instansiyalar tərəfindən məqbul və (hələlik) yeganə çıxış yolu hesab

[1] dw.com, *Vaşinton tuarid ictima məclis əl-Əmn və İsrail təqsif Qəzza*, 16.05.2021, https://www.dw.com/ar

[2] Anadolu Agentliyi, *Vaşinton tuarid təhqiq əl-Cinaiyyə bi-cəraim hərb fi Filəstin*, 04.03.2021, https://www.aa.com.tr/ar

edilir. Bu təşəbbüs 1967-ci ilin sərhədləri əsasında iki müstəqil və suveren dövlətin təsisi meyarı ilə irəli sürülüb. Azərbaycan Respublikası da beynəlxalq ictimaiyyətin və İƏT-in bu həlli yolunu dəstəklədiyini bildirir.

## ƏDƏBİYYAT SİYAHISI
## *(References)*

1- Anadolu Agentliyi, *Vaşinton tuarid təhqiq əl-Cinaiyyə bi-cəraim hərb fi Filəstin*, 04.03.2021, https://www.aa.com.tr/ar
2- BBC.Arabic, *əl-Muğarridun yədəhəddəsunə ən səfqətil-qərn*, 18.02.2018, https://www.bbc.com/arabic/43097662
3- Samih Şubeyb, *əl-İstitan vəl-hicrə fil-fikr əs-Səhyuni*, Mərkəz Əbhas əl-Filəstiniyyə, Ramallah (1999)
4- General Assembly, *Resolution 181 (II). Future government of Palestine*, https://unispal.un.org/DPA/DPR/unispal.nsf/0/7F0AF2BD897689B785256C330061D253
5- Məcdi İsa, *Qərarat əl-Umamiyyə vəl-Qədiyyəl-Filəstiniyyə*, Mərkəz Əbhas əl-Filəstiniyyə, əl-Birə, (1999)
6- U.S.Department of State, *Declaration of Principles on Interim Self-Government Arrangements*, 2003, https://web.archive.org/web/20030823194850/http://www.state.gov/p/nea/rls/22602.htm
7- Al-Jazeera, *Bunud mubadərət əs-səlam əl-ərəbiyyə*, 3.10.2004, https://www.aljazeera.net/2004/10/03/
8- Frans24.com, *əl-İttihad əl-Urubi yətəbir ət-təcil muxəyyib lil-amal*, 30,04,2021, https://www.france24.com/ar
9- dw.com, *Vaşinton tuarid ictima məclis əl-Əmn və İsrail təqsif Qəzza*, 16.05.2021, https://www.dw.com/ar